AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
NƏSİMİ ADINA DİLÇİLİK İNSTİTUTU

# AZƏRBAYCAN DİLİNİN ORFOQRAFİYA LÜĞƏTİ

*Yenidən işlənmiş 7-ci nəşr*

**Bakı – "Elm" – 2021**

*Elmi redaktor:*

***Möhsün Nağısoylu***
Azərbaycan Milli Elmlər Akademiyasının
həqiqi üzvü, filologiya elmləri doktoru, professor

*Məsul redaktorlar:*

***İsmayıl Məmmədli***
filologiya elmləri doktoru, professor

***Nəriman Seyidəliyev***
filologiya elmləri doktoru

*Rəyçilər:*

***Qəzənfər Kazımov***
filologiya elmləri doktoru, professor,
Əməkdar elm xadimi

***Buludxan Xəlilov***
filologiya elmləri doktoru, professor

***Şəhla Əhmədova***
filologiya üzrə fəlsəfə doktoru, dosent

**Azərbaycan dilinin orfoqrafiya lüğəti.**
Bakı, "Elm", 2021, – 756 səh.

ISBN 978-9952-523-37-9

Kitab Azərbaycan Respublikası Nazirlər Kabinetinin 16 aprel 2019-cu il tarixli qərarı ilə təsdiqlənmiş və 3 noyabr 2020-ci il tarixli 438 nömrəli qərarı ilə müəyyən dəyişiklik edilmiş "Azərbaycan dilinin orfoqrafiya normaları" əsasında hazırlanmış ilk nəşrdir. Lüğətə 90 minə yaxın söz daxil edilmişdir.

655 (07) – 2021



**Hər bir xalqın milliliyini, mənəvi dəyərlərini yaşadan, inkişaf etdirən onun dilidir.**

**Heydər Əliyev**
*Ümummilli lider*



**Əsrlər boyu bizi xalq kimi, millət kimi qoruyub saxlayan bizim ana dilimizdir, Azərbaycan dilidir.**

**İlham Əliyev**

*Azərbaycan Respublikasının Prezidenti*

# KİTABIN İÇİNDƏKİLƏR

# ÖN SÖZ

Məlum olduğu kimi, Azərbaycan dilinin orfoqrafiya lüğəti ədəbi dildə işlənən sözlərin düzgün yazılış formalarını özündə ehtiva edən və peşəsindən, vəzifəsindən asılı olmayaraq, həmin dilin daşıyıcısı olan hər bir kəsin, cəmiyyətin hər bir üzvünün – bir sözlə, bütün vətəndaşların istifadəsi üçün zəruri olan dəyərli və mötəbər bir qaynaqdır. Mükəmməl və sanballı orfoqrafiya lüğəti dövrün dil mənzərəsini əks etdirməklə yanaşı, eyni zamanda onun söz varlığının keçmişini və bu gününü, sözyaratma imkanlarının zənginliyini də ortaya qoyur ki, bu baxımdan da bütövlükdə cəmiyyət üçün xüsusi əhəmiyyət daşıyır. Məhz buna görə də elmi əsaslara söykənən, Azərbaycan dilinin bütün üslublarının rəngarəng lüğət tərkibini əhatə edən orfoqrafiya lüğətinin tərtibi çətin və məsuliyyətli olduğu qədər, həm də mühüm və əhəmiyyətli bir işdir.

Hər hansı bir dilin lüğət tərkibində zaman keçdikcə müəyyən dəyişikliklər baş verir ki, bu təbii proses də həmin dilin orfoqrafiya lüğətinin yenilənməsini bir zərurət kimi ortaya qoyur. Yaşadığımız qloballaşma dövründə Azərbaycan dilinin lüğət tərkibində də ciddi dəyişikliklər özünü göstərmiş və ədəbi dilimiz zamanın tələbi ilə bir sıra yeni anlayışları ifadə edən söz və ifadələrlə xeyli zənginləşmişdir. Azərbaycan xalqının ümummilli lideri, ana dilimizin böyük hamisi və qayğıkeşi Heydər Əliyevin 2 yanvar 2003-cü il tarixli fərmanı ilə qüvvəyə minmiş "Azərbaycan Respublikasında dövlət dili haqqında Azərbaycan Respublikasının Qanunu"nun 13-cü maddəsinin 2-ci bəndində bu zəruri və mühüm amil nəzərə alınaraq yazılır: "Müvafiq icra hakimiyyəti orqanı 5 ildə bir dəfədən az olmayaraq yazı dili normalarını təsbit edən lüğətin (orfoqrafiya lüğətinin) nəşr olunmasını təmin edir".

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 9 aprel 2013-cü il tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı"nın 6.4. bəndində də Azərbaycan dilinin təkmilləşdirilmiş yeni orfoqrafiya lüğətinin hazırlanması qeyd olunur.

Azərbaycan dilinin ilk orfoqrafiya lüğəti 90 il bundan əvvəl – 1929-cu ildə nəşr olunmuşdur. Vəli Xuluflunun latın qrafikalı əlifba əsasında tərtib etdiyi bu orfoqrafiya (imla) lüğətindəki sözlərin sayı cəmi 11 min olmuşdur. Orfoqrafiya lüğətinin sonrakı təkmilləşdirilmiş nəşrləri 1940, 1960, 1975, 2004-cü illərdə işıq üzü görmüşdür. Həmin nəşrlərdəki sözlərin sayı sıra ilə aşağıdakı kimi olmuşdur: 20 min, 40 min, 58 min, 80 min. 2013-cü ildə nəşr olunmuş sonuncu orfoqrafiya lüğəti isə həcminə görə daha böyük olmuşdur.

Lüğətdəki sözlərin sayı 104 (əlavələrlə birlikdə 110) mini keçir. "Azərbaycan dilinin orfoqrafiya lüğəti"nin yeni – yeddinci nəşrindəki sözlərin sayı isə 90 minə yaxındır.

Qeyd etmək lazımdır ki, "Azərbaycan dilinin orfoqrafiya lüğəti"nin 1929-cu il nəşri istisna olmaqla, digər nəşrləri Milli Elmlər Akademiyası tərəfindən hazırlanıb çap edilmişdir. Yuxarıda adı çəkilən mötəbər dövlət Qanununa uyğun olaraq, Azərbaycan Milli Elmlər Akademiyasının İmadəddin Nəsimi adına Dilçilik İnstitutu 2017-ci ilin sonundan etibarən Azərbaycan dilinin orfoqrafiya lüğətinin yeni – yeddinci nəşrinin tərtibi işinə başlamışdır. Bunun üçün əvvəlcə Azərbaycan dilinin orfoqrafiya normalarının layihəsi hazırlanmış və ilk dəfə olaraq geniş ictimaiyyətin müzakirəsinə çıxarılmışdır. Bir ilə yaxın müddət ərzində cəmiyyətin bütün təbəqələrinin iştirakı ilə qəzet səhifələrində və sosial şəbəkələrdə gedən müzakirələr zamanı mütəxəssislər və adi vətəndaşlar tərəfindən yeni orfoqrafiya qaydalarına dair bir çox faydalı təkliflər, tövsiyələr irəli sürülmüş və onların əksəriyyəti, əsasən, nəzərə alınmışdır. Əvvəlki orfoqrafiya qaydaları ilə müqayisədə bir sıra yenilikləri əhatə edən yeni orfoqrafiya normaları Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2019-cu il 16 aprel tarixli 174 nömrəli qərarı ilə təsdiq olunmuş və 3 noyabr 2020-ci il tarixli qərarı ilə müəyyən dəyişiklik edilmişdir.

"Azərbaycan dilinin orfoqrafiya lüğəti"nin sonuncu 2013-cü il nəşri haqqında müsbət fikirlərlə yanaşı, bir sıra iradlar, fərqli və mübahisəli yanaşmalar da irəli sürülmüşdür. Lüğətin yeni nəşri hazırlanarkən göstərilən qeydlər və təkliflər nəzərə alınmış və onların islahı istiqamətində zəruri redaktə işləri yerinə yetirilmişdir. Redaktə işlərinin nəticəsində sözügedən lüğətdən 18 mindən çox söz çıxarılmışdır. Bu qəbildən olan sözlər sırasında ərəb və fars dillərindən alınma qəliz və çətin anlaşılan sözlər, eləcə də bəzi qondarma və arxaikləşmiş sözlər üstünlük təşkil edir. Qeyd edək ki, 2013-cü il nəşrindəki mübahisəli məqamlarla bağlı redaktə işi heç də asan olmamışdır. Bu bir danılmaz həqiqətdir ki, ana kitabımız "Kitabi-Dədə Qorqud" eposu, eləcə də İmadəddin Nəsimi, Şah İsmayıl Xətai, Məhəmməd Füzuli və digər klassik sənətkarlarımızın əsərləri orta məktəblərdə tədris olunur və həmin əsərlərdən müəyyən nümunələr "Ədəbiyyat müntəxəbatı" kitablarına da daxil edilir. Belə olan halda sözügedən əsərlərdə tez-tez işlənən artıq arxaikləşmiş qədim türk sözlərinin, habelə bir sıra ərəb və fars sözlərinin orfoqrafiya lüğətinə salınmaması, təbii ki, düzgün sayıla bilməz. Bu məsələdə biz optimal variantı seçərək klassik mətnlərdə daha işlək olan və müasir Azərbaycan ədəbi dili üçün arxaik səciyyə daşıyan sözlərin lüğətə daxil edilməsini məqsədəuyğun saydıq. Bundan əlavə, XIX əsrin söz ustalarından Qasım bəy Zakir, Mirzə Fətəli Axundzadə və Seyid Əzim Şirvaninin, eləcə də sonrakı yüzilliyin əvvəllərində yaşayıb-yaratmış Cəlil Məmmədquluzadə, Mirzə Ələkbər Sabir, Məhəmməd Hadi, Abbas Səhhət, Nəcəf bəy Vəzirov,

Əbdürrəhim bəy Haqverdiyev, Cəfər Cabbarlı və b. sənətkarların bədii əsərlərinin dilində çox işlənən bir sıra sözləri də yeni lüğətə daxil etməyi məqsədəuyğun saydıq.

Lüğətin yeni nəşrində dünya təcrübəsinə əsasən dialekt leksikasına, danışıqda işlənən sözlərə də müəyyən yer ayrılmışdır. Qeyd edək ki, yalnız bir neçə bölgədə işlənən və əsasən, peşə-sənət bildirən, etnoqrafik səciyyəli, eləcə də Süleyman Rəhimov, İlyas Əfəndiyev, Mir Cəlal, Mirzə İbrahimov, İsmayıl Şıxlı və b. görkəmli yazıçıların dilində rast gəlinən dialektizmlərin məhəlli söz kimi yeni lüğətə daxil edilməsi məqsədəuyğun sayıldı.

Yeni orfoqrafiya lüğətinin tərtibində "Azərbaycan dilinin izahlı lüğəti"ndən, habelə "Azərbaycanca-rusca lüğət", "Azərbaycanca-ingiliscə lüğət", çoxsaylı terminoloji lüğətlər, "Azərbaycan dilinin dialektoloji lüğəti", Türkiyədə nəşr olunmuş "Yazım kılavuzu" və s. kimi dəyərli qaynaqlardan yetərincə istifadə olunmuşdur. Lüğətdə yer almış bir sıra arxaizmlərin, dialektizmlərin qarşısında zəruri hallarda aydınlıq üçün onların mənaları da verilmişdir. Məsələn: çalası *(qatıq mayası)*, gənəş *(məsləhət)*, güz *(payız)* və s. Lüğətin yeni nəşrində bir çox neologizmlərin (onların sırasında dilimizə yeni daxil olmuş terminlər üstünlük təşkil edir) işləndiyi sahə də göstərilmişdir. Məsələn: *ekstralinqvistik (dilç.), ekstranet (inform.), kolobaşki (idm.), komplussiv (psix.)* və s. Bundan əlavə, "Azərbaycan dilinin orfoqrafiya lüğəti"nin 2013-cü il nəşrində eyni sözün tez-tez nəzərə çarpan sinonimlərinin verilməsi halları yeni nəşrdə aradan qaldırılmışdır. Məsələn, dildə işlənmək vəziyyəti nəzərə alınmaqla əvvəlki lüğətə daxil edilmiş *kvorum – yetərsay, plyaj – çimərlik, svetofor – işıqfor, vzvod – taqım, yubka - ətək* və s. kimi sinonim sözlərdən yalnız ikincilər yeni lüğətdə saxlanılmışdır. Bununla belə, dünya təcrübəsində olduğu kimi, tarixiliyi və sözlərin işlənmə vəziyyətini nəzərə alaraq, müstəqillik dövründə ədəbi dilimizə daxil olmuş bir sıra neologizmlərin əvvəlki sinonimlərinin də lüğətdə saxlanılmasını məqsədəuyğun saydıq. Məsələn: *hospital – xəstəxana, hotel – mehmanxana, soyad – familiya* və s.

"Azərbaycan dilinin orfoqrafiya lüğəti"nin 2013-cü il nəşri haqqındakı tənqidi fikirlərdə də qeyd olunduğu kimi, lüğətdə eyni sözün müxtəlif fonetik variantlarına rast gəlmək mümkündür. Məsələn: *altın – altun, qaboy – qoboy, satin – sətin, təlmə-tələsik – tələm-tələsik, yornuq – yorğun* və s. Lüğətin yeni nəşri hazırlanarkən bu məsələyə də xüsusi diqqət yetirilmiş və eyni sözlərin çoxvariantlılığı halları aradan qaldırılmışdır. Qeyd edək ki, lüğətin yeni nəşrində yuxarıdakı nümunələrin ikinci variantları saxlanılmışdır.

Müasir dövrdə bütün dünya dillərində olduğu kimi, Azərbaycan dilinin lüğət tərkibində də nəzərə çarpacaq dərəcədə zənginləşmə prosesi getməkdədir. Bu proses Azərbaycan Respublikasının 1991-ci ildə dövlət müstəqilliyi qazanması və dünya ölkələri ilə müxtəlif sahələrdə çoxcəhətli əlaqələrin genişlənməsinin məntiqi nəticəsi olaraq daha da sürətlənmişdir. Təkcə belə

bir faktı qeyd etmək lazımdır ki, sonuncu orfoqrafiya lüğətinin nəşrindən sonra AMEA İmadəddin Nəsimi adına Dilçilik İnstitutunun əməkdaşları tərəfindən "Yeni sözlər və yeni mənalar lüğəti" (Bakı, 2016), "Yeni terminlər lüğəti", I-II cildlər (Bakı, 2016, 2018) nəşr olunmuşdur ki, bu kitablardakı sözlər, təbii ki, əvvəlki lüğətdə yoxdur. Bundan başqa, lüğət haqqındakı tövsiyələrdə də qeyd olunduğu kimi, orfoqrafiya lüğətinin son nəşrində bəzi əsl Azərbaycan sözləri (məsələn: *qavram, ora, uca* və s.) diqqətsizlik ucundan yer almamışdır. Bütün bunların hesabına yeni orfoqrafiya lüğətinə əvvəlki nəşrdə olmayan 5.000-dən çox söz daxil edilmişdir. Bu qəbildən olan sözlərin bir hissəsi dilimizin daxili imkanları hesabına son zamanlarda yaranmış neologizmlərdən ibarətdir. Məsələn: *buraç, paylaşım, tanıtım, uzadıcı* və s. Lüğətdə müasir dövrdə güclü inkişafda olan elm və texnikanın müxtəlif sahələrində, eləcə də mətbuat, radio, televiziya, kino dilində və bu sahələrin sıx bağlı olduğu informatika, informasiya texnologiyaları, müasir kommunikativistika sistemində işlənən sözlərlə yanaşı, logistika, idman, kulinariya və turizm terminləri də verilmişdir.

Mütəxəssislərə, geniş ictimaiyyətə təqdim olunan "Azərbaycan dilinin orfoqrafiya lüğəti"nin yeni – 7-ci nəşrini AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun əməkdaşları: şöbə müdiri, filologiya elmləri doktoru, professor İsmayıl Məmmədli (A, B, C), filologiya elmləri doktorları Nəriman Seyidəliyev (G, K, M) və Tünzalə Baxşıyeva (E, Ə, U), filologiya üzrə fəlsəfə doktorları Fidan Salayeva (D, H), Xədicə Heydərova (R, Ş, T), Sitarə Əliyeva (Ç), Ləman Qasımlı (F, S), Fizuli Mustafayev (İ, J, Y), aparıcı elmi işçi Nigar Ağayeva (X, N, P) və elmi işçi Sevinc Səfərova (Q, L) hazırlamışlar. O, Ö, Ü, V, Z hərflərini Dilçilik İnstitutunun sabiq əməkdaşı professor Nadir Məmmədli tərtib etmişdir. Orfoqrafiya lüğətindəki texniki işləri filologiya üzrə fəlsəfə doktoru Arzu Hüseynova yerinə yetirmişdir.

Orfoqrafiya lüğəti AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun Elmi Şurasının 28 iyun 2019-cu il tarixli qərarı ilə çapa tövsiyə olunmuşdur.

Oxuculardan xahiş olunur ki, lüğət haqqında arzu və təkliflərini AMEA İmadəddin Nəsimi adına Dilçilik İnstitutuna göndərsinlər (Az1143, Bakı şəhəri, Hüseyn Cavid prospekti, 115, Azərbaycan Milli Elmlər Akademiyası, Nəsimi adına Dilçilik İnstitutu).

**Möhsün NAĞISOYLU**

*AMEA Nəsimi adına Dilçilik İnstitutunun direktoru, akademik*

# AZƏRBAYCAN DİLİNİN ORFOQRAFİYA NORMALARI

**(Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2019-cu il 16 aprel tarixli 174 nömrəli qərarı ilə təsdiqlənmiş və 3 noyabr 2020-ci il tarixli 438 nömrəli qərarı ilə müəyyən dəyişiklik edilmişdir)**

## 1. Azərbaycan mənşəli sözlərin yazılışı

1.1. Azərbaycan dilinin lüğət tərkibindəki Azərbaycan mənşəli sözlər, əsasən, tələffüz edildiyi kimi yazılır: *addım, dəniz, gəlin, günəş, qoşun, oğul, qaranquş* və s.

1.2. Son səsi **[x]**, bəzən də **[ğ]** kimi tələffüz olunan Azərbaycan mənşəli sözlər **q** hərfi ilə yazılır: *ayaq, barmaq, bulaq, dayanacaq, qatıq, qonaq, qorxaq* və s. Bu qəbildən olan sözlərə saitlə başlanan şəkilçi qoşulduqda **q~ğ** əvəzlənməsi baş verir: *otağa, bulağın, qonağımız* və s.

1.3. Son səsi **[x′]** kimi tələffüz olunan çoxhecalı Azərbaycan mənşəli sözlər **k** hərfi ilə yazılır: *bilək, birlik, külək, ürək, üzərlik, üzük* və s. Bu qəbildən olan sözlərə saitlə başlanan şəkilçi qoşulduqda **k~y** əvəzlənməsi baş verir: *biləyi, birliyimiz, ürəyim, üzüyün* və s.

**Qeyd.** Son səsi **[k]** kimi tələffüz olunan alınma sözlərə saitlə başlanan şəkilçi qoşulduqda heç bir dəyişiklik baş vermir: *əmlak – əmlaka, iştirak – iştirakımız, şərik – şəriki* və s.

1.4. Son səsi [**t**], bəzən də [**d**] kimi tələffüz olunan çoxhecalı Azərbaycan mənşəli sözlər **d** hərfi ilə yazılır: *bulud, palıd, söyüd* və s.

1.5. Son səsi **[ç],** bəzən də **[c]** kimi tələffüz olunan sözlər **c** hərfi ilə yazılır: *qılınc, ülgüc, kərpic* və s.

## 2. Alınma sözlərdə saitlərin yazılışı

2.1. Tərkibində **o** hərfi olan alınma sözlər **[a]** və ya **[o]** ilə tələffüz edilməsindən asılı olmayaraq, **o** ilə yazılır: *avt**o**mat, k**o**llec, k**o**llektiv, lab**o**rant, M**o**skva, m**o**tor, **o**byekt, **O**dessa, p**o**ema, p**o**eziya, pr**o**blem, pr**o**fessor, s**o**list, vel**o**siped* və s.

2.2. İkinci hecasındakı saiti **[i]**, bəzən də **[ü]** kimi tələffüz olunan ərəb mənşəli sözlər tarixi-ənənəvi prinsipə əsasən **i** ilə yazılır: *külli, müdir, müdrik, müflis,müxbir, müxlis, münbit, münsif, mürid, mürşid, müsibət* və s.

**Qeyd.** *Mühüm, müşkül* və *üfüq* sözlərindəki ikinci heca ***ü*** hərfi ilə yazılır.

2.3. Mənbə dildə **[u]** saitli alınma sözlər **ü** hərfi ilə yazılır: *b**ü**lleten, b**ü**ro, j**ü**ri, karb**ü**rator, komp**ü**ter, paraş**ü**t, s**ü**jet, şl**ü**z* və s.

2.4. Mənbə dildə **a** hərfi ilə bitən alınma sözlər iki cür yazılır:

2.4.1. *aksiom, anket, aptek, atmosfer, diaqram, diaspor, fabrik, fonem, kaset, kayut, konfet, kontor, qəzet, qrafem, qravür, leksem, lent, maşın, perspektiv, planet, proqram, pyes, reklam, rezin, sistem, sistern, sitat, teorem, vitrin* və s. kimi sözlərin sonunda **a** hərfi yazılmır;

Mənbə dildə tərkibində qoşa **b, p, n** və **m** samitləri olan aşağıdakı sözlərin sonunda **a** ilə yanaşı, qoşa samitlərdən biri də atılır: *abreviatur, qrup, ton, diaqram, stenoqram* və s.

2.4.2. *botanika, doktrina, forma, kamera, qrammatika, norma, poetika, poeziya, respublika, taktika* və s. kimi sözlərin sonunda **a** yazılır.

2.5. Mənbə dildə birhecalı sözlər iki cür yazılır:

2.5.1. iki saitlə yazılanlar: *cisim, eyib, ətir, feil, fəsil, fikir, heyif, isim, izin, qəbir, qədir, qisim, meyil, nəsil, ömür, səbir, sətir, sinif, şeir, şəkil, zehin* və s.

2.5.2. bir saitlə yazılanlar: *cəbr, əmr, həbs, həsr, hökm, hüsn, hüzn, kəsr, qəbz, qəhr, qəsr, nəbz, nəfs, nəsr, sehr, sədr, üzr, üzv, zülm* və s.

## 3. Alınma sözlərdə samitlərin yazılışı

3.1. Rus dilində tərkibində **ц** hərfi olan alınma sözlərin yazılışında aşağıdakı qaydalar əsas götürülür:

3.1.1. ümumi isimlər **s** hərfi ilə yazılır: *aseton, dosent, konsert, lisey, kulminasiya, aksiya, sement, sirk* və s.;

**Qeyd.** *Metso, vitse* morfemləri və *blits, ratsiya* və s. sözlər istisnadır.

3.1.2. xüsusi isimlərdə sözün əvvəlində **s** (*Setkin, Siolkovski* və s.), sözün ortasında və axırında isə **ts** (*Motsart, Muromets, Vorontsov* və s.) yazılır.

3.2. Rus dilində tərkibində **щ** hərfi olan alınma sözlərin yazılışında aşağıdakı qaydalar əsas götürülür:

3.2.1. sözün əvvəlində və sonunda işlənən **щ** hərfi əvəzinə **ş** yazılır: *Şedrin, Şerba, Şors, borş* və s.;

3.2.2. ortasında **щ** hərfi olan sözlər qoşa **ş** ilə yazılır: *meşşan, Vereşşagin* və s.

3.3. **H** samiti ilə başlanan alınma sözlər **h** ilə yazılır: *Haaqa, Hamburq, harmoniya, Havana, Hegel, hektar, Heyne, hidrogen, hippodrom, hospital, humanizm* və s.

3.4. Birinci və ikinci hecasındakı samiti həm **[m],** həm də **[n]** kimi tələffüz olunan alınma sözlər **n** ilə yazılır: *anbar, günbəz, İstanbul, qənbər, sünbül, şənbə, tənbəl, zanbaq, zənbil* və s.

3.5. **-iy, -skiy** ilə bitən xüsusi isimlərin sonundakı **y** yazılmır: *Qordlevski, Qorki, Mayakovski, Yaroslavski* və s.

3.6. Kimyəvi element adları əslinə uyğun olaraq yazılır: *kalium, maqnezium, natrium* və s.

3.7. Əsli **[c]** samitli alınma sözlər **c** ilə də yazılır: *Cek London, cemper, Siciliya* və s.

3.8. Əsli **[q]** samitli alınma sözlər incə saitli hecalarda **g** ilə yazılır: *biologiya, dialektologiya, general, genezis, geologiya, gigiyena, etimologiya, gitara* və s.

3.9. Əsli **w** samitli alınma sözlər **v** hərfi ilə yazılır: *veb-sayt, Vilyam, vörd* və s.

3.10. Son səsi **[k′]** kimi tələffüz olunan bir qrup alınma sözlər **q** hərfi ilə yazılır: *filoloq, ittifaq, müstəntiq, natiq, şəfəq, üfüq, vərəq* və s. Bu qəbildən olan sözlərin sonuna saitlə başlanan şəkilçi qoşulduqda, yazıda heç bir dəyişiklik baş vermir: *filoloqa, şəfəqi, üfüqə* və s.

## 4. Qoşasaitli və qoşasamitli sözlərin yazılışı

4.1. Kökündə eynicinsli qoşa və müxtəlifcinsli sait işlənən alınma sözlər qoşa saitlə yazılır: *ailə, bədii, camaat, əcaib, əmtəə, ideal, maaş, müalicə, okean, saat, stadion, zəif* və s.

4.2. Hecalarından biri **[p]** samiti ilə bitən, sonrakı hecasının ilk samiti **[b]** kimi tələffüz olunan sözlər qoşa **p** ilə yazılır: *guppultu, hoppanmaq, şappıltı, tappıltı, toppuz* və s.

4.3. Hecalarından biri **[k]** samiti ilə bitən, sonrakı hecasının ilk samiti **[g]** kimi tələffüz olunan sözlər qoşa **k** ilə yazılır: *mürəkkəb, mütəkkə, səkkiz* və s.

4.4. Hecalarından biri **[t]** samiti ilə bitən, sonrakı hecasının ilk samiti **[d]** kimi tələffüz olunan sözlər qoşa **t** ilə yazılır: *əlbəttə, hətta, Səttar* və s.

4.5. Hecalarından biri **[k′]** samiti ilə bitən, sonrakı hecasının ilk samiti **[q]** kimi tələffüz olunan sözlər qoşa **q** ilə yazılır: *diqqət, doqquz, nəqqaş, saqqal* və s.

4.6. Mənbə dildə tərkibində **qq, ll, mm, pp**, **tt** samitləri olan Avropa mənşəli aşağıdakı alınma sözlər (*apellyasiya* sözü istisnadır) bir samitlə yazılır: *aqlütinativ, paralel, teleqram, aparat, vat* və s.

4.7. Təkhecalı sözlərin sonunda qoşa samitin hər ikisi yazılır: *fənn, haqq, hiss, xətt, küll, rədd, sirr, zənn, zidd* və s.

Belə sözlərə samitlə başlanan şəkilçi artırdıqda, qoşa samitlərdən biri düşür: *fənn – fənlər, haqq – haqsız, xətt – xətdən, sirr – sirlər* və s.

**Qeyd.** *Hiss* və *küll* sözləri istisnadır. *Hiss* sözünə yalnız **-siz** şəkilçisi artırdıqda, kökdəki **s** samitlərindən biri ixtisar olunur.

4.8. Mənbə dildə qoşa samitlə bitən iki və ya çoxhecalı sözlər bir samitlə yazılır: *hüsnxət, kilovat, mühüm, rəsmxət* və s.

4.9. Söz ortasında qoşa **s** samiti olan aşağıdakı alınma sözlər bir **s** ilə yazılır: *aksesuar, kaset, masaj, pasaj, şose*.

4.10. Söz sonunda qoşa **s** samitli aşağıdakı alınma sözlər bir **s** ilə yazılır: *ekspres, konqres, kros, bras, stres* və s.

**Qeyd.** *Press (mətbuat)* sözü istisnadır.

## 5. Şəkilçilərin yazılışı

5.1. Tərkibində **a-, anti-, ba-, bi-, na-, pre-** ön şəkilçiləri olan sözlər bitişik yazılır: *anormal, antivirus, baməzə, bisavad, nalayiq, prepozisiya* və s.

**Qeyd. Anti** şəkilçisindən sonra xüsusi isim gəldikdə, defis işarəsi qoyulur: *anti-Azərbaycan, anti-Rusiya* və s.

5.2. Sözdüzəldici şəkilçilər aşağıdakı üç qaydaya əsasən yazılır:

5.2.1. ahəng qanununa tabe olmayan və **bir cür** yazılan şəkilçilər:

**-i** şəkilçisi: samitlə bitən sözlərdə **-i;** *cənubi, daxili, elmi, həyati, Naxçıvani, şimali, Şirvani, tarixi* və s. saitlə bitən sözlərdə isə şəkilçinin əvvəlinə **v** samiti artırılır: *ailəvi, dairəvi, Gəncəvi, kütləvi* və s.;

**-vari** şəkilçisi: *buynuzvari, qalxanvari, üzükvari, yüngülvari* və s.;

**-keş** şəkilçisi: *qayğıkeş, zəhmətkeş, cəfakeş;*

**-daş** şəkilçisi: *yoldaş, əməkdaş, yurddaş, soydaş;*

-**stan** şəkilçisi: samitlə bitən sözlərdə şəkilçinin əvvəlinə ahəng qanununa uyğun olaraq **ı, i, u, ü** saitlərindən biri artırılır: *Dağıstan, Türkmənistan, Monqolustan, Türküstan;* saitlə bitən sözlərdə isə şəkilçi olduğu kimi qalır: *Gürcüstan.*

**-gil** şəkilçisi: *bacımgil, xalamgil, Əhmədgil* və s.;

**-zadə** şəkilçisi: *xanzadə, bəyzadə, Axundzadə* və s.;

5.2.2. **iki cür** yazılan şəkilçilər:

kar samitlə bitən sözlərdə: **-qan, -kən;** cingiltili samitlə bitən sözlərdə **-ğan, -gən** şəkilçisi: *çalışqan, yapışqan, döyüşkən, sürüşkən, deyingən* və s.;

**-ağan, -əyən** şəkilçisi: *qaçağan, güləyən, küsəyən* və s.;

5.2.3. **dörd cür** yazılan şəkilçilər:

**-kı, -ki, -ku, -kü** şəkilçisi: *axşamkı, bildirki, səhərki, gündüzkü* və s.;

sifət və isim düzəldən **-ı, -i, -u, -ü** şəkilçisi: *darçını, badımcanı, narıncı, çərkəzi, armudu, gümüşü* və s.;

saitlə bitən sözlərdə bu şəkilçinin əvvəlinə **y** samiti artırılır: *bənövşəyi, buğdayı, xurmayı, sürməyi* və s.

5.3. Feil köklərindən isim və sifət düzəldən şəkilçilər:

5.3.1. **Kar samitlə bitən sözlərdə:**

**-qı, -ki, -qu, -kü** şəkilçisi: *asqı, seçki, pusqu, sürtkü* və s.;

**-qın, -kin, -qun, -kün** şəkilçisi: *satqın, bitkin, tutqun, ötkün* və s.;

5.3.2. **cingiltili samitlə bitən sözlərdə:**

**-ğı, -gi, -ğu -gü** şəkilçisi: *çalğı, vergi, vurğu, bölgü* və s.;

**-ğın, -gin, -ğun, -gün** şəkilçisi: *qırğın, əzgin, yorğun, süzgün* və s.

5.4. Rəqəmlə yazılan miqdar saylarına mənsubiyyət və hal şəkilçiləri əlavə edildikdə, şəkilçidən əvvəl defis qoyulur: *2-yə, 3-də, 5-i, 6-nın, 17-si, 20-dən.* Rəqəmlərdən sonra ahəng qanununa görə sıra sayının şəkilçisi ixtisarla **(-cı, -ci, -cu, -cü**) yazılır: *2-ci, 3-cü, 6-cı, 10-cu.*

5.5. Roma rəqəmlərindən sonra şəkilçi yazılmır: *beşinci – V, onuncu – X* və s.

## 6. Mürəkkəb sözlərin yazılışı

6.1. Aşağıdakı hallarda sözlər bitişik yazılır:

6.1.1. bir vurğu ilə deyilən müxtəlif mənalı sözlər: *arabir, balacaboy, beşillik, beşmərtəbəli, bugünkü, dilucu, əmioğlu, bacıoğlu, xalaoğlu, gülərüz, günəbaxan, hərgecəki, köhnəfikirli, qalxanabənzər, qanunvericilik, qarasaçlı, qurultayqabağı, müxtəliftərəfli, özbaşınalıq, soyuqqanlı, ucdantutma, ümumbəşəri, yenifikirli* və s.;

6.1.2. eyni feil kökünün təkrarı və **a, ə, ha** bitişdiriciləri vasitəsilə yaranan mürəkkəb isimlər: *qaçaqaç, kəsəkəs, gəlhagəl, tutatut, vurhavur və s.;*

**Qeyd.** Sözün kökü kar samitlə bitdikdə, ahəng qanununa görə **a, ə;** cingiltili samitlə bitdikdə isə **ha** bitişdiricisi yazılır. *Gethaget* sözü istisnadır.

6.1.3. eyni sözün təkrarı və ***ba, bə*** bitişdiriciləri vasitəsilə yaranan mürəkkəb zərflər: *addımbaaddım, aybaay, günbəgün, ilbəil* və s.

6.2. Tərkibində ***aero-, aqro-, audio-, avia-, avto-, ekzo-, endo-, elektro-, foto-, makro-, mikro-, mini-, mono-, multi-, nano-, neo-, oksi-, oliqo-, paleo-, para-, post-, proto-, psevdo-, psixo-, stereo-, super-, tele-, termo-, trans-, ultra-, ümum-*** morfemləri olan mürəkkəb sözlər bitişik yazılır: *aeroklub, aqromüxtəliflik, audioəlaqə, aviasalon, avtopark, endoplazma, mikrocərrahiyyə, elektromaqnit, fotoçəkiliş, miniavtobus, monopredikativ, monokristal, multimilyonçu, nanotexnologiya, nanohissəcik, neofaşizm, neorealizm, oksitetrasiklin, oliqofreniya, paleoxəritə, paramaqnetizm, postsovet, psixonevroloji, postmodernizm, prototürk, stereotəsvir, superdövlət, supermarket, teletamaşa, termoaçar, transmilli, ultrasəs, ümumbəşəri* və s.

**Qeyd.** Bu morfemlərin bəziləri xüsusi isimlərə qoşulduqda, defislə yazılır: *trans-Asiya, trans-Avropa, trans-Avrasiya, trans-Qafqaz, paleo-Azərbaycan, proto-Azərbaycan, ümum-Azərbaycan, ümum-Avropa* və s.

6.3. Tərkibindəki sözlərin səciyyəsindən asılı olaraq aşağıdakı mürəkkəb sözlər defislə yazılır:

6.3.1. qoşa sözlər: *adda-budda, aşıq-aşıq, az-maz, dedi-qodu, əzik-üzük, hələm-qələm, kağız-kuğuz, qara-qura, qonaq-qara, sür-sümük* və s.;

6.3.2. tərkibində **art-, eks-, əks-, kontr-, qeyri-, ober-, veb-, vitse-** morfemləri olan mürəkkəb sözlər: *art-obyekt, eks-prezident, əks-səda, kontr-admiral, qeyri-adi, qeyri-iradi, ober-leytenant, veb-dizayner, veb-səhifə, vitse-admiral;*

6.3.3. izafət birləşmələri: *həddi-büluğ, külli-aləm, külli-ixtiyar, nöqteyi-nəzər, tərcümeyi-hal, tərzi-hərəkət* və s.;

6.3.4. mürəkkəb coğrafi sözlər: *cənub-qərb, şərq-qərb, şimal-şərq* və s.;

6.3.5. tərkibində mənaca bir-birinə yaxın və ya əks anlayışları bildirən sözlər: *ab-hava, adlı-sanlı, ağıllı-kamallı, az-çox, baş-ayaq, dərə-təpə, dinməz-söyləməz, elə-belə, gec-tez, iki-üç, naz-qəmzə, nəvə-nəticə, ölüm-itim, pis-yaxşı, söz-söhbət, təhvil-təslim, ucsuz-bucaqsız* və s.;

6.3.6. ölçü vahidlərini bildirən isimlər: *kiloelektron-volt, kilovat-saat, qram-kalori* və s.;

6.3.7. birinci tərəfi sifətin dərəcə əlaməti kimi işlənən **açıq** və **tünd** sözlərinin, eləcə də müəyyən məna çaları bildirən **ala** sözünün iştirakı ilə yaranan mürəkkəb sifətlər: *açıq-sarı, tünd-göy, ala-seyrək* və s.

**Qeyd.** Tərkibində **təhər** morfemi olan sifətlər istisnadır: bu cür sözlər bitişik yazılır: *göytəhər, sarıtəhər* və s.

## 7. Köməkçi sözlərin yazılışı

7.1. **İdi, imiş, ikən** köməkçi sözləri adlardan (isim, sifət, say, əvəzlik), saitlə bitən zərflərdən və feillərdən sonra ayrı, samitlə bitən feillərdən sonra həm ayrı, həm də ilk saiti buraxılaraq, şəkilçiləşmiş variantlarda bitişik yazılır: *uşaq idi, uşaq ikən, uşaq imiş, gəlirkən, gəlirmiş, gəlməli idi, gəlməli ikən, gecə idi, gecə ikən, gəlməli imiş, gəlmiş imiş, gəlmişdi* və s.

**Qeyd.** Saitlə bitən feillərdən sonra gələn bu köməkçi sözlər ilk saiti buraxılaraq, **y** bitişdiricisinin əlavəsi ilə bitişik də yazıla bilər: *almalıydı, gəlməliymiş, alaydı, alasıydı, gəlməliydi* və s.

7.2. Qoşmalar iki cür yazılır:

7.2.1. təkhecalı qoşmalar **(-can, -cən, -dək, -tək)** aid olduqları sözə bitişik yazılır: *dağacan, evəcən, küçəyədək, quştək* və s.;

7.2.2. ikihecalı qoşmalar **(ilə, kimi, qədər, ötrü, təki, üçün)** aid olduqları sözdən ayrı yazılır: *gəmi ilə, adam kimi, ondan ötrü, sənin təki, şagird üçün* və s.

**Qeyd.** 1. **İlə** qoşması samitlə bitən sözlərdə ahəng qanununa uyğun olaraq **-la, -lə** şəklində bitişik yazıla bilər: *qatar**la**, qələm**lə*** və s.

2. *Etibarilə, məqsədilə, münasibətilə, vasitəsilə* sözləri bitişik yazılır.

7.3. Mənşəcə mürəkkəb olan bağlayıcılar bitişik yazılır: *çünki, habelə, halbuki, həmçinin, hərçənd, hərgah, nəinki, yaxud, yainki* və s.

7.4. Tərkibi bağlayıcılar və bağlayıcı sözlər ayrı yazılır: *belə ki, buna görə, buna görə də, bunun üçün, bununla da, daha da, guya ki, həm də, odur ki, ona görə də, ona görə, onun üçün də, tutaq ki, və ya, və yaxud, kim ki, o zaman ki, onda ki* və s.

7.5. Ədatlar aid olduqları sözlərdən ayrı yazılır: *daha gözəl, dedim də, di get, ən yaxşı, gör ha, lap pis, sən ki* və s.

**-mı, -mi, -mu, -mü; -sana, -sənə, -ca, -cə** ədatları aid olduqları sözlərə bitişik yazılır: *Qəşəngdir**mi**? Oxudu**mu**? A kos-kosa, gəl**sənə**, torbanı doldur**sana**! Yaxşı**ca** dincəldim. İndi**cə** gəlmişik* və s.

7.6. Eyni nidanın təkrarından əmələ gələn nidalar defislə yazılır: *bəh-bəh, ha-ha-ha, pəh-pəh, uy-uy, vay-vay* və s.

7.7. Müxtəlif sözlərdən əmələ gələn nidalar ayrı yazılır: *ay aman, ay haray.*

## 8. Birinci hərfi böyük yazılan sözlər

8.1. Ad, soyad, təxəllüs və ləqəb bildirən sözlərin (*bəy*, *oğlu* və *qızı* sözlərindən başqa) birinci hərfi böyük yazılır: *Nizami Gəncəvi, İmadəddin Nəsimi, Uzun Həsən, Şah İsmayıl Xətai, Məhəmməd Füzuli, Mirzə Fətəli Axundzadə, Xan qızı Natəvan, Süleyman Sani Axundov, Üzeyir bəy Əbdülhüseyn oğlu Hacıbəyli, Mehdi Hüseynzadə, Səməd Vurğun, Süleyman Rüstəm, Bəxtiyar Vahabzadə* və s.

**Qeyd.** Xüsusi isimlər cəm şəkilçisi qəbul etdikdə də böyük hərflə yazılır: *Nizamilər, Füzulilər, Hacı Qaralar, Həzi Aslanovlar, Mehdi Hüseynzadələr* və s.

8.2. Bədii əsərlərdə heyvanlara və cansız əşyalara verilən adlar böyük hərflə yazılır: *Alapaça, Badə, Bəng, Bozdar, Qırat, Məstan* və s.

8.3. Tarixi hadisələrin, dövrlərin, sülalələrin, eləcə də qədim yazılı abidələrin və s. adlarının birinci sözünün ilk hərfi böyük yazılır: *Azadlıq meydanı, Çaldıran döyüşü, Dəmir dövrü, Orxon-Yenisey abidələri, Sasanilər dövrü, Səfəvilər sülaləsi, Şuşa qalası, Versal sülhü, Vətən müharibəsi, Yeddiillik müharibə* və s. Belə mürəkkəb adlara fərqləndirici söz əlavə olunduqda, onun da birinci hərfi böyük yazılır: *Orta Paleolit dövrü, Son Paleolit dövrü.*

8.4. Ölkələrin, muxtar respublikaların, vilayət və diyarların rəsmi adlarının tərkibindəki bütün sözlərin ilk hərfi böyük yazılır: *Azərbaycan Respublikası, Birləşmiş Ərəb Əmirlikləri, İran İslam Respublikası, Naxçıvan Muxtar Respublikası* və s.

8.5. Səmavi kitabların, fəza cisimlərinin adları böyük hərflə yazılır: *Quran, Bibliya, Əhdi-cədid, Əhdi-ətiq, İncil, Tövrat, Zəbur, Ülkər, Günəş, Ay, Yupiter, Saturn, Venera* və s.

8.6. Ali dövlət vəzifələri – Azərbaycan Respublikasının Prezidenti, Azərbaycan Respublikasının Birinci vitse-prezidenti, Azərbaycan Respublikasının Baş naziri, Azərbaycan Respublikası Milli Məclisinin sədri kimi yazılır. Dövlət orqanları (qurumları), birlik, cəmiyyət, akademiya, universitet, kollec, teatr, filarmoniya, siyasi partiya, tarixi günlər və s. bu kimi mürəkkəb adların bütün sözlərinin (*adına, üzrə, və, yanında, qarşı* və s. bu kimi yardımçı sözlərdən başqa) birinci hərfi böyük yazılır: Azərbaycan Respublikasının Nazirlər Kabineti, Azərbaycan Respublikasının Milli Məclisi, Azərbaycan Respublikasının Xarici İşlər Nazirliyi, Azərbaycan Milli Elmlər Akademiyasının Nəsimi adına Dilçilik İnstitutu, Bakı Beynəlxalq Multikulturalizm Mərkəzi, Yeni Azərbaycan Partiyası, Azərbaycan Respublikasının Səfərbərlik və Hərbi Xidmətə Çağırış üzrə Dövlət Xidməti, Bakı Şəhər İcra Hakimiyyəti, Ağstafa Rayon Təhsil Şöbəsi və s.

**Qeyd.** 1. Dövlət rəmzlərinin, həmçinin tərkibində *gün* sözü olan və təqvimə düşən əlamətdar günlərin adlarında bütün sözlər böyük hərflə

yazılır: *Azərbaycan Respublikasının Dövlət Himni, Beynəlxalq Ana Dili Günü, Beynəlxalq Qadınlar Günü, Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü* və s.

2. Məşhur tarixi gün və bayram adlarında yalnız birinci sözün ilk hərfi böyük yazılır: *İyirmi yanvar, İyirmi səkkiz may, Səkkiz mart, Qurban bayramı, Novruz bayramı* və s. Həmin günlər rəqəmlə göstərilərsə, 20 Yanvar, 28 May, 8 Mart və s. rəqəmdən sonrakı birinci sözün ilk hərfi böyük yazılır.

3. *Azərbaycan Respublikasının səhiyyə naziri, Azərbaycan Respublikasının kənd təsərrüfatı naziri* tipli mürəkkəb adlarda sahə (*səhiyyə*) və vəzifə (*nazir*) bildirən söz kiçik hərflə yazılır.

4. Tərkibində *lisey, gimnaziya, vəqf, məktəb, fakültə, şöbə* sözləri olan mürəkkəb adlarda ilk söz böyük, sonrakı sözlər kiçik hərflə yazılır: *Avropa liseyi, Dəyanət vəqfi, Humanitar fənlər gimnaziyası, Humanitar siyasət məsələləri şöbəsi, Uşaq-gənclər şahmat məktəbi, BDU-nun Filologiya fakültəsi, Nəsimi adına Dilçilik İnstitutunun Terminologiya şöbəsi* və s.

5. Tərkibində *okean, dəniz, çay, göl, şəhər, rayon, qəsəbə, kənd, prospekt, meydan, küçə, xiyaban, saray, qala, türbə, qoruq, boğaz, düz, ada, burun, körpü, düzənlik, dağ, səhra, dərə* sözləri olan adlarda ilk söz böyük hərflə yazılır: *Sakit okean, Xəzər dənizi, Qara dəniz, Kür çayı, Baykal gölü, Bakı şəhəri, Salyan rayonu, Şüvəlan qəsəbəsi, Hökməli kəndi, Neftçilər prospekti, Azadlıq meydanı, Əhməd Cavad küçəsi, Şəhidlər xiyabanı, Səadət sarayı, Ramana qalası, Möminə xatun türbəsi, Şirvan qoruğu, Dardanel boğazı, Mil düzü, Nargin adası, Xudafərin körpüsü, Culfa düzənliyi, Kəpəz dağı, Qaraqum səhrası, İynə burnu*.

8.7. Fəxri adların özək hissəsini təşkil edən ilk söz böyük hərflə, sonrakı sözlər kiçik hərflə yazılır: *Əməkdar müəllim, Əməkdar incəsənət xadimi, Xalq şairi* və s.

**Qeyd.** *Azərbaycanın Milli Qəhrəmanı, Sovet İttifaqı Qəhrəmanı* mürəkkəb adlarında hər üç söz böyük hərflə yazılır.

8.8. *Orden, medal, bədii əsər, opera, balet, kinofilm, qəzet, jurnal, kinoteatr, mehmanxana, nəşriyyat, kafe, restoran* və s. adları dırnaqda və birinci sözü böyük hərflə yazılır: *"Vətənə xidmətə görə" ordeni, "Dövlət qulluğunda fərqlənməyə görə" medalı, "Ata və oğul" povesti, "Yeddi gözəl" baleti, "Uzaq sahillərdə" filmi, "Azərbaycan" qəzeti, "Cücələrim" kafesi, "Bahar" mağazası, "Badamlı" mineral suyu* və s.

**Qeyd.** Dırnaqda yazılan belə adlara artırılan şəkilçi dırnaqdan kənarda yazılır: *"Xalq qəzeti"nin bugünkü nömrəsi, "Yeddi gözəl"in ilk tamaşası* və s.

8.9. *Mirzə, hacı, şeyx, seyid, şah, sultan, bəyim* və s. sözlər *rütbə, ləqəb* və *titul* bildirib, aid olduğu sözlərdən əvvəl gəldikdə böyük hərflə, sonra gəldikdə isə kiçik hərflə yazılır: *Hacı Qara, Mirzə Fətəli, Nadir şah, Seyid Əzim, Sultan Süleyman, Şah İsmayıl, Şeyx Nəsrullah* və s.

**Qeyd.** *Ağa, bəy, xan, xanım* sözləri insan adlarının tərkib hissəsi kimi işləndikdə bitişik yazılır: *Ağacavad, Ağabəy, Əlibəy, Xanoğlan, Böyükxanım* və s. Həmin sözlər adlara qoşularaq titul kimi və ya hörmət məqsədilə işləndikdə isə ayrı yazılır: *Abbasqulu ağa Bakıxanov, Nəcəf bəy Vəzirov, Fətəli xan Xoyski, Fatma xanım Kəminə* və s.

## 9. İxtisarlar və qısaltmalar

9.1. İxtisar və qısaltmalar aşağıdakı kimi yazılır:

9.1.1. Tam ixtisarlar (akronimlər) və qısaltmalar aid olduqları sözlərə uyğun olaraq böyük hərflə yazılır: *Azərbaycan Respublikası - AR, Birləşmiş Millətlər Təşkilatı - BMT, Milli Məclis - MM* və s.;

9.1.2. Tam ixtisarlar (akronimlər) ümumi isimlərə aid olduqda kiçik hərflə yazılır: *metr - m, cild - c, və sairə - və s., və başqaları - və b.*

9.1.3. Yarımçıq ixtisarlar aid olduqları sözlərə uyğun olaraq, böyük və ya kiçik hərflərlə, mürəkkəb adların tərkib hissələri isə bitişik yazılır: *akademik – akad., doktor – dok., dosent - dos., professor – prof., Azərbaycan Dövlət Nəşriyyatı - Azərnəşr* və s.

9.2. İxtisarlara (akronimlərə) əlavə edilən şəkilçilər son səsin tələffüzünə uyğun olaraq yazılır: *AMEA-dan, MDB-nin, UNESCO-nun, İSESCO-da, BDU-ya* və s.

## 10. Sözün sətirdən sətrə keçirilməsi

10.1. Sözlər sətirdən sətrə hecalarla keçirilir: *və-tən, mək-təb-li-lər* və s.

Sözün bir saitdən ibarət olan hecasını sətrin sonunda saxlamaq və ya yeni sətrə keçirmək olmaz: *a-ilə, a-zadlıq, iddi-a* və s. Bu qəbildən olan sözlər sətirdən sətrə bu şəkildə keçirilir: *ai-lə, azad-lıq, id-dia* və s.

10.2. Saylar rəqəmlə yazıldıqda, onlara artırılan şəkilçilər sətirdən sətrə keçirilmir: *5-cilər, 7-ci, 9-da* və s.

10.3. Mürəkkəb ixtisarlar və onlara artırılan şəkilçilər sətirdən sətrə keçirilmir.

10.4. Ad və ata adlarının bir hərfdən ibarət qısaltmalarını (*M.F.Axundzadə, M.S.Ordubadi, Y.V.Çəmənzəminli* və s.) sətrin sonunda saxlamaq olmaz.

10.5. Durğu işarələri yeni sətrə keçirilmir.

## LÜĞƏTİN QURULUŞU

**1.** Lüğətdə sözlər əlifba sırası ilə verilmişdir.

**2.** Lüğətə Azərbaycan ədəbi dilinin lüğət tərkibinə daxil olan sözlər salınmışdır ki, bunları başlıca olaraq aşağıdakı qruplara ayırmaq olar:

a) dilimizin lüğət tərkibinin ayrılmaz hissəsini təşkil edən xüsusi terminlər (minimum həcmdə);

b) vaxtilə dilimizin lüğət tərkibində işlək olmuş, indi isə yalnız keçmiş həyatın müxtəlif cəhətlərini əks etdirmək üçün lazım olan, ayrı-ayrı ədəbiyyatlarda istifadə edilən köhnəlmiş sözlər: *baqqal, biyar, qoçu, yüzbaşı* və s.;

c) bir neçə bölgəyə məxsus və görkəmli yazıçıların dilində işlənən məhəlli sözlər;

ç) xalq və tayfa adları;

d) defislə yazılan mürəkkəb sözlər: *arvad-uşaq, dağ-daş, gecə-gündüz, tez-tez, yavaş-yavaş* və s.;

e) mətbuat və ədəbiyyatda geniş yayılmış, həmçinin canlı dildə işlənən mürəkkəb sözlərin ixtisar edilmiş formaları: *demblok, interpol, internet, univermaq* və s.;

ə) səs təqlidi sözlərdən əmələ gələn və müxtəlif şəkildə yazılanlar: *cik-cik, gurultu, şaqqıltı* və s.

**3.** Lüğətə coğrafi adlar, şəxs adları, müasir ədəbi dildə işlənməyən qəliz ərəb və fars sözləri, yalnız bir məhəllə və məhdud peşəkarlar dairəsində işlənən sözlər (arqotizmlər), əsasən, daxil edilmir.

**4.** Mənası geniş oxucu kütləsi üçün aydın olmayan bəzi söz və terminlərin qarşısında aşağıdakı kimi qısa izah və ya üslubi işarələr (izahlar kursivlə, terminlər isə mötərizədə kursivlə) verilir:

anadil, *quş*
edikt (*tar.*)
esperanto (*dilç.*)
karbürator (*tex.*)
qır-qıra, *oyuncaq*
tənbölən (*riyaz.*)

**5.** Tək işlənməyən sözlər tərkib daxilində verilir; bunların ikinci hissəsi kursivlə verilir:

cərgəli *əkin*
çağrı *mərkəzi*
sinov *getmək*
vaz *keçmək*

**6.** Tələffüzcə yaxın olan, lakin yazılış və mənaca fərqlənən sözlərə aşağıdakı kimi izah verilir:

atlas, *xəritə*

atlaz, *parça*
nigah, *baxış*
nikah, *kəbin*
servis, *xidmət*
serviz, *qab dəsti*

**7.** Omonimlər ayrı-ayrı sözlər kimi deyil, bir söz kimi verilir.

**8.** İsimlər adlıq halda verilir: *dağ-daş, dostluq, əlüzyuyan, ər-arvad, pambıqçı, taxılbiçən* və s.

**9.** İsimlərin kiçiltmə və əzizləmə şəkilləri lüğətdə ayrıca söz kimi verilir: *adamcığaz, evcik, kişiciyəz, qızcığaz* və s.

**10.** Xalq, tayfa və sülalə adları, eləcə də cəm halda işlədilən elmi terminlər aşağıdakı kimi verilir:

ağqoyunlu (-lar)
ayağıpərdəli (-lər)
azərbaycanlı (-lar)
kəsrani (-lər)
qoşadırnaqlı (-lar)
pəncəüzgəcli (-lər)

**11.** Bütün feili isimlər lüğətdə verilir (*daşma, döymə, qazma* və s.).

**12.** Xüsusi işarələri olan sözlər aşağıdakı kimi verilir:

faiz, *%*
iks, *x*
iqrek, *y*
paraqraf, *§*

**13.** Əsli (*ağ, qara, sarı...*), düzəltmə (*iqtisadi, kəskin, naməlum...*) və mürəkkəb (*çoxmərtəbəli, uzaqvuran, uzunsaçlı...*) sifətlər lüğətə daxil edilir.

**14.** Sifətin *-raq-rək; -ımtıl-umtul-ümtül; -sov; -mtraq* və digər şəkilçilərinin qoşulması ilə düzələn azaltma (*ağımtıl, göyümtül, göyümsov, sarımtraq, uzunsov, yaxşıraq*) və *m, p, r* ünsürlərinin köməyi ilə düzələn çoxaltma dərəcəsi (*qıpqırmızı, tərtəmiz, yamyaşıl*) lüğətdə verilir.

**15.** Feli sifətlərdən yalnız substantivləşmiş (isimləşmiş) sözlər lüğətdə verilir (*çalan, oxuyan, ölmüş, qarımış...*).

**16.** Lüğətdə defislə yazılan feili bağlamalara aid nümunələr də verilmişdir: *gələr-gəlməz, ötürə-ötürə, püfləyə-püfləyə...*

**17.** Yalnız bir kökdən ibarət olan miqdar (*bir, iki, otuz, yüz, min...*) və qeyri-müəyyən (*az, çox...*) saylar lüğətə daxil edilir.

**18.** Sıra sayları aşağıdakı kimi verilir:

birinci, 1-ci, I
ikinci, 2-ci, II
beşinci, 5-ci, V
onuncu, 10-cu, X

iyirminci, 20-ci, XX
otuzuncu, 30-cu, XXX
qırxıncı, 40-cı, XL
əllinci, 50-ci, L
yüzüncü, 100-cü, C
beşyüzüncü, 500-cü, D
mininci, 1000-ci, M

**19.** Şəxs, işarə, sual, qayıdış, qeyri-müəyyən və təyini əvəzliklər (*mən, o, hansı, öz, kimisi, kimsə, bütün...*) lüğətdə verilir. Ayrı yazılan əvəzliklər (*nə isə, heç nə...*) lüğətdə verilmir.

**20.** Sadə və düzəltmə, məlum (*ağarmaq, demək, getmək, oxumaq, yazmaq...);* məchul *(deyilmək, oxunmaq, yazılmaq...*); qayıdış (*döyünmək, görünmək, yuyunmaq...*); qarşılıq-birgəlik (*boğuşmaq, deyişmək, gülüşmək, yazışmaq...*) və icbar (*açdırmaq, dedirtmək, oxutmaq, oxutdurmaq, yazdırmaq, yazdırtmaq...*) feilləri lüğətdə ayrıca söz kimi verilir.

**21.** *Atıb-tutmaq, aşıb-daşmaq, deyib-gülmək* kimi mürəkkəb feillər əlifba sırası ilə verilir.

**22.** Sadə, düzəltmə və mürəkkəb zərflər (*tez, gec, qəhrəmancasına, tez-tez, dalbadal, qabaq-qabağa...*) lüğətdə verilir.

**23.** Bütün qoşmalar lüğətə daxil edilir (*görə, ötrü, üçün...*)

**24.** Yalnız sadə (*həm, və, əgər...*) və bitişik yazılan mürəkkəb (*hərçənd, hərgah, nəinki...*) bağlayıcılar lüğətdə verilir.

**25.** Yalnız sadə (*bəh, eh, ha...*) və təkrar yolu ilə düzələn mürəkkəb (*bəh-bəh, hay-hay...*) nidalar lüğətə daxil edilir.

# LÜĞƏTDƏKİ İXTİSARLAR

*anat.* – anatomiya
*arx.* – arxeologiya
*astr.* – astronomiya
*avia.* – aviasiya
*bayt.* – baytarlıq
*biol.* – biologiya
*bot.* – botanika
*coğr.* – coğrafiya
*dan.* – danışıq dilində
*dəniz.* – dənizçilik
*dilç.* – dilçilik
*din.* – dinşünaslıq
*dipl.* – diplomatiya
*d.y.* – dəmiryol termini
*ekol.* – ekologiya
*elek.* – elektrik
*etn.* – etnoqrafiya
*əcz.* – əczaçılıq
*ədəb.* – ədəbiyyatşünaslıq
*fəls.* – fəlsəfə
*fiz.* – fizika
*fiziol.* – fiziologiya
*folk.* – folklor
*geod.* – geodeziya
*geofiz.* – geofizika
*geol.* – geologiya
*gömr.* – gömrük
*hərb.* – hərbi
*hüq.* – hüquq
*xalç.* – xalçaçılıq
*idm.* – idman
*iqt.* – iqtisadiyyat
*inc.* – incəsənət
*inform.* – informatika
*kim.* – kimya
*kinem.* – kinematoqrafiya
*kosm.* – kosmetika
*k.t.* – kənd təsərrüfatı
*kul.* – kulinariya
*kult.* – kulturologiya
*log.* – logistika
*mal.* – maliyyə
*memar.* – memarlıq
*meşəç.* – meşəçilik
*metal.* – metallurgiya
*məh.* – məhəlli
*mənt.* – məntiq
*miner.* – mineralogiya
*mus.* – musiqi
*müh.* – mühasibat
*paleon.* – paleontologiya
*ped.* – pedaqogika
*poliq.* – poliqrafiya
*psix.* – psixologiya
*riyaz.* – riyaziyyat
*sənət.* – sənətşünaslıq
*siyas.* – siyasətşünaslıq
*sosiol.* – sosiologiya
*stat.* – statistika
*şahm.* – şahmat
*tar.* – tarix
*teatr.* – teatrşünaslıq
*tex.* – texniki
*tib.* – tibb
*zool.* – zoologiya

## AZƏRBAYCAN ƏLİFBASI

| | | | |
|---|---|---|---|
| **Aa** | a | **Qq** | qe |
| **Bb** | be | **Ll** | el |
| **Cc** | ce | **Mm** | em |
| **Çç** | çe | **Nn** | en |
| **Dd** | de | **Oo** | o |
| **Ee** | e | **Öö** | ö |
| **Əə** | ə | **Pp** | pe |
| **Ff** | fe | **Rr** | er |
| **Gg** | ge | **Ss** | se |
| **Ğğ** | ğe | **Şş** | şe |
| **Hh** | he | **Tt** | te |
| **Xx** | xe | **Uu** | u |
| **Iı** | ı | **Üü** | ü |
| **İi** | i | **Vv** | ve |
| **Jj** | je | **Yy** | ye |
| **Kk** | ke | **Zz** | ze |

# Aa

aba (*məh.*)
abad
abadan
abadanlıq
abadlaşdırılma
abadlaşdırılmaq
abadlaşdırma
abadlaşdırmaq
abadlaşma
abadlaşmaq
abadlıq
abadlıq-quruculuq
abajur
abajurlu
abandon (*iqt.*)
abasbəyi, *armud*
abazin (-lər)
abaziya
abbası
abbasılıq
abbasi (-lər) (*tar.*)
abbat
abbatlıq
abdal
abdali (-lər)
abdallaşma
abdallaşmaq
abdəst
abdəstxana
abdəstli
abdəstlik
abdəstsiz
abdominal (*tib.*)
abduksiya
abduktor
abgərdan
ab-hava
ab-havalı
abxaz (-lar)
abxazca
abı
abıca (*zool.*)
abılıq
abır
abır-həya
abır-həyalı
abır-həyasız
abır-ismət
abır-ismətli
abırlama
abırlamaq
abırlandırma
abırlandırmaq
abırlanma
abırlanmaq
abırlı
abırlı-həyalı
abırlı-ismətli
abırlılıq
abırsız
abırsız-abırsız
abırsızca
abırsızcasına
abırsız-həyasız
abırsız-ismətsiz
abırsızlıq
abıtəhər
abid
abidcəsinə
abidə
abidə-bulaq
abidəətrafı
abidəqoyma
abidəli
abidəsiz
abidəyanı
abidləşmə
abidləşmək
abidlik
abi-həyat
abi-kövsər
abiogenez (*biol.*)
abionim
abiotik
abiotrofiya
abituriyent
abi-zəmzəm
abqora
abqoralı
abqoralıq
abqorasız
ablastika
ablativ (*dilç.*)
ablaut
ablefariya
ablepsiya
ablyasiya (*coğr.*)
abonement
abonent
aborigen
abort
abortiv
abortivlik (*bot.*)
abortsanq (*tib.*)
abraxiya
abraziv
abrazivlik
abraziv-maye
abraziya (*geol.*)
abreviasiya (*dilç.*)
abreviatur (*dilç.*)
abrikotin
abroqasiya (*hüq.*)
absans
absent
absenteizm
absentizm
abses
absesektomiya
absesoqrafiya

absida (*memar.*)
absis (*riyaz.*)
absolyut (*fəls.*)
absolyutizm
absolyutluq
absorbent
absorber
absorbsiometr
absorbsiometriya
absorbsiya
absorbsiyaedici
abstinensiya
abstraksionizm
abstraksiya
abstrakt
abstraktlaşdırılma
abstraktlaşdırılmaq
abstraktlaşdırma
abstraktlaşdırmaq
abstraktlaşma
abstraktlaşmaq
abstraktlıq
absurd
absurdluq
abuliya (*tib.*)
abunə
abunəçi
abzas
abzaslama
abzaslamaq
abzaslanma
abzaslanmaq
ac
ac-acına
acar (-lar)
acarca
ac-çılpaq
acdırma
acdırmaq
acgödən
acgöz

acgözcəsinə
acgözlük
acı
acı-acı
acıağacı
acı-ağrı
acı-ağrılı
acı-ağrısız
acıbaldırğan
acıbiyan
acıca
acıçiçək
acıdil
acıdilli
acıdillilik
acıxəmrə
acıq
acıqca
acıqıcı (*bot.*)
acıq-qıcıq
acıqlandırma
acıqlandırmaq
acıqlanma
acıqlanmaq
acıqlı
acıqlı-acıqlı
acıqlılıq
acıquşəppəyi
acılama
acılamaq
acılandırma
acılandırmaq
acılanma
acılanmaq
acılaşdırma
acılaşdırmaq
acılaşma
acılaşmaq
acılatma
acılatmaq
acılı

acılı-ağrılı
acılıca (*bot.*)
acılıq
acılıqotu
acılı-şirinli
acıma
acımaq
acımsov
acımtıl
acımtıllıq
acımtıl-şirin
acınacaq
acınacaqlı
acındırıcı
acındırma
acındırmaq
acınma
acınmaq
acıotu
acıpaxla
acıpaxlalı
acıpencər
acıpencərli
acışa-acışa
acışdıra-acışdıra
acışdırıcı
acışdırma
acışdırmaq
acışma
acışmaq
acıtəhər
acıtərə
acıtərəli
acıtərəsiz
acıtma
acıtmaq
acıtmalı
acıtmalıq
acıtmasız
acıyonca
acıyovşan

acı-zəhrimar
acı-zəqqum
acika (*kul.*)
aciz
aciz-aciz
acizanə
aciz-avara
acizcə
acizcəsinə
acizlənmə
acizlənmək
acizləşdirmə
acizləşdirmək
acizləşmə
acizləşmək
acizlik
acqalma
acqarına
acqursaq
acqursaqlıq
aclıq
acma
acmaq
ac-susuz
ac-susuzluq
ac-yalavac
ac-yalavaclıq
ac-yorğun
açа-açа
açar
açar-açmaz
açarçı
açarçılıq
açarqayıran
açarlama
açarlamaq
açarlanma
açarlanmaq
açarlı
açarsız
açdırılma

açdırılmaq
açdırma
açdırmaq
açdırtma
açdırtmaq
açıb-ağartma
açıb-ağartmaq
açıb-bağlama
açıb-bağlamaq
açıb-bükmə
açıb-bükmək
açıb-örtmə
açıb-örtmək
açıb-tökmə
açıb-tökmək
açıb-yığma
açıb-yığmaq
açıb-yumma
açıb-yummaq
açıcı
açıq
açıq-açığına
açıq-aşkar
açıq-aşkarca
açıq-aşkarcasına
açıq-aşkarlıq
açıq-aydın
açıqbəniz
açıqbənizli
açıqbənizlik
açıq-bənövşəyi
açıq-boz
açıqca
açıqcasına
açıqça
açıq-çəhrayı
açıqdan
açıqdan-açığa
açıqfikirli
açıqfikirlilik
açıqgöz

açıqgözlü
açıqgözlülük
açıq-qara
açıq-qəhvəyi
açıqqəlbli
açıq-qırmızı
açıqlama
açıqlamaq
açıqlanma
açıqlanmaq
açıqlıq
açıqraq
açıqrəngli
açıq-saçıq
açıq-saçıqlıq
açıq-sarı
açıqtəhər
açıqürək
açıqürəkli
açıqürəklilik
açıq-yaşıl
açılar-açılmaz
açılı *qalmaq*
açılıb-bağlanma
açılıb-bağlanmaq
açılıb-örtülmə
açılıb-örtülmək
açılıb-tökülmə
açılıb-tökülmək
açılıb-yığılma
açılıb-yığılmaq
açılım
açılımlı
açılış
açılışa-açılışa
açılışdan-açılışa
açılışma
açılışmaq
açılma
açılmaq
açılmaz

açılsabah (*bot.*)
açım
açırım
açış
açma
açmaq
açma-yığma
açma-yumma
ad
ada
adacıq
adaçayı
adadovşanı
adaətrafı
adax
adaxlama
adaxlamaq
adaxlandırma
adaxlandırmaq
adaxlanma
adaxlanmaq
adaxlı
adaxlıbazlıq
adaxlılıq
adaiçi
adajio (*mus.*)
adaq (*məh.*)
adalı
adam
adamağladan
adamaldadan
adamaoxşamaz
adamaoxşar
adamayovuşan
adamayovuşmaz
adambaşı
adambaşına
adamboyu
adamcanlı
adamcanlılıq
adamcasına
adamcığaz
adamcıq
adamcıl
adamcıllıq
adamçaşdıran
adam-gün (*iqt.*)
adamincidən
adamkökü (*bot.*)
adamlı
adamlıq
adamoynadan
adamöldürən
adam-saat (*iqt.*)
adamsatan
adamsevməz
adamsevməzlik
adamsız
adamsızlıq
adamtanıma
adamtanıyan
adamyana
adamyeyən
adaptasiya
adapter
adaptiv
adaptogen (-lər)
adasız
adaş
adaşlıq
adayanı
adbaad
adda-budda
adda-buddalıq
addəyişmə
addım
addım-addım
addımbaaddım
addımbasdı, *oyun*
addımbaşı
addımlama
addımlamaq
addımlatma
addımlatmaq
addımlı
addımlıq
addımölçən
addison (*tib.*)
additiv
additivlik
adduksiya
adekvat
adekvatlıq
adenoid (-lər)
adenoma
adenovirus
adentiya
adət
adətcə
adətdənkənar
adətən
adət-ənənə
adətincə
adətkərdə
adətsiz
adıçəkilən
adıgedən
adıgey (-lər)
adıgeycə
adına *günü*
adi
adicə
adil
adilanə
adilcəsinə
adiləşdirilmə
adiləşdirilmək
adiləşdirmə
adiləşdirmək
adiləşmə
adiləşmək
adilik
adillik

**açılsabah - adillik**

adinamiya (*tib.*)
adqoydu
adqoyma
adlama
adlamac, *çayiçi yol*
adlamaq
adlandırılma
adlandırılmaq
adlandırma
adlandırmaq
adlanma
adlanmaq
adlatma
adlatmaq
adlı
adlıq (*dilç.*)
adlı-sanlı
administrasiya
administrativ
administrator
administratorluq
admiral
admiralitet
admirallıq
admiral-mühəndis
adonis (*bot.*)
adoptasiya (*hüq.*)
adrenalin
adrenoreseptor
adres
adresant
adresat
ad-san
ad-sanlı
adsız
adsızlıq
adsız-sansız
adsorber
adsorbsiya
adsorbsiyaedici
advalor

adventist
adventizm
adverbial (*dilç.*)
adverbiallaşma (*dilç.*)
advermə
adyal
adyalüzü
adyektiv
adyektivləşmə
adyektivləşmək
adyunkt
adyutant
adyutantlıq
aerasiya
aero
aerob (*biol.*)
aerobağlama
aeroballistik
aeroballistika
aerobaza
aerobika
aerobiologiya
aerobioloji
aerobiont
aerobios
aerobomba
aerobus
aerodinamik
aerodinamika
aerodrom
aerofiltr
aerofit (-lər) (*bot.*)
aerofizik
aerofizika
aerofon
aerofotoaparat
aerofotoçəkiliş
aerofotokadr
aerofotokamera
aerofotoqrafiya
aerofotometr

aerogen (*tib.*)
aerogeologiya
aerogeoloji
aeroxizək
aeroiqlim
aeroion (-lar)
aerokadr
aerokəşfiyyat
aerokinoaparat
aerokirşə
aeroklub
aerokosmik
aeroqatar
aeroqliserin
aeroqraf
aeroqrafiya
aerolit
aerologiya
aeroloji
aeroloq
aeromaqnit
aeromayak
aeromexanik
aeromexanika
aeromexaniki
aerometr
aerometrik
aeromorfoz
aeronaviqasiya
aeronavt
aeronavtika
aeronomiya
aeroplan
aeropoçt
aeroport
aerosalon
aerosəpin
aerosinoptika
aerosolyari
aerostansiya
aerostat

